**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

# GƏNC MÜƏLLİM

QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

Sentyabr 2016
09 (1079)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## "Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair Milli Strategiyanın həyata keçirilməsi üzrə 2016-2020-ci illər üçün Dövlət Proqramı"nın təsdiq edilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, "Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair 2014-2020-ci illər üçün Milli Strategiya"nın təsdiq edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2014-cü il 2 aprel tarixli 359 nömrəli Sərəncamının 3.1-ci bəndinin icrasını təmin etmək məqsədi ilə **qərara alıram:**

1. "Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair Milli Strategiyanın həyata keçirilməsi üzrə 2016-2020-ci illər üçün Dövlət Proqramı" təsdiq edilsin.
2. Bu sərəncamın 1-ci hissəsi ilə təsdiq edilmiş dövlət proqramında nəzərdə tutulmuş tədbirlərin icrasının əlaqələndirilməsi Azərbaycan Respublikasının Rabitə və Yüksək Texnologiyalar Nazirliyinə həvalə edilsin.
3. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 20 sentyabr 2016-cı il*

## V Bakı Beynəlxalq Humanitar Forumu keçirildi

Sentyabr ayının 29-30-da Bakıda V Bakı Beynəlxalq Humanitar Forum keçirilib. Forum çərçivəsində dünyanın müxtəlif ölkələrindən siyasət, elm və mədəniyyət elitasının görkəmli nümayəndələrinin iştirakı ilə 6 dəyirmi masa keçirilib.

İştirakçılar "Multikulturalizmin müxtəlif modelləri: nəzəriyyədən humanist təcrübəyə doğru"; "İnsanların kütləvi yerdəyişməsi şəraitində insan kapitalının qorunmasının önəmi davamlı inkişafın əsası kimi"; "Jurnalistikanın informasiya dövrünə transformasiyası və onun sivilizasiyalararası dialoqun təmin edilməsində rolu"; "Davamlı inkişaf və ekoloji sivilizasiya"; "Molekulyar biologiya, biofizika, biotexnologiya və müasir tibb sahəsində kadrlar hazırlığı məsələləri: innovativ və etik problemlər"; "Texnologiyaların konvergensiyası və gələcəyə dair proqnozlar: XXI əsrin əsas çağırışları" mövzularında fikir mübadiləsi aparıblar.

Tədbirin sonunda bəyannamə qəbul olunub.

Xatırladaq ki, Bakı Beynəlxalq Humanitar Forumu - bəşəriyyətdə maraq doğuran qlobal xarakterli məsələlərə dair geniş spektrli dialoqlar, fikir mübadilələri və müzakirələr aparmaq məqsədi ilə hər il tanınmış dövlət xadimlərini, elmin müxtəlif sahələri üzrə Nobel mükafatı qaliblərini və nüfuzlu beynəlxalq təşkilatların rəhbərlərini, o cümlədən dünyanın siyasət, elm və mədəni elitasının görkəmli nümayəndələrini bir araya toplayan tədbirdir.

Qeyd edək ki, 2010-cu ildən keçirilən forumun təşəbbüsçüləri Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev və Rusiya Federasiyasının o zamankı prezidenti Dmitri Medvedev olub.

**İctimaiyyətlə əlaqələr şöbəsi**

## ADPU-nun rektoru, professor Cəfər Cəfərov Rektoryanı Şuranın iclasını keçirib

Sentyabr ayının 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Rektoryanı Şuranın iclasını keçirib. Rektoryanı Şuranın iclasında ADPU-nun prorektorları, fakültə dekanları, kafedra müdirləri və struktur bölmələrinin rəhbərləri iştirak ediblər. İclasda 2016-2017-ci tədris ilində qarşıda duran vəzifələr müzakirə edilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov Rektoryanı Şuranın iclasında bildirib ki, yay tətili dövründə universitetdə cari və əsaslı təmir işləri həyata keçirilib. ADPU təmir və tikinti işlərinin davam etdirilməsi məqsədilə maliyyə vəsait ayrılması üçün Nazirlər Kabinetinə məktubla müraciət etməyi qərara alıb. Eyni zamanda ADPU-nun yataqxanaları ilə bağlı da Nazirlər Kabinetinə müraciət edilməsi barədə qərar qəbul edilib. Müraciətdə həmin yataqxanalarda müvəqqəti məskunlaşmış məcburi köçkün soydaşlarımızın müvafiq yaşayış yerləri ilə təmin edilmələri və ADPU-nun tələbəgənclərinin yataqxanalarda yerləşdirilmələri üçün kömək göstərilməsi xahiş edilir. Hazırda ADPU-nun 4 yataqxanasında bütünlüklə məcburi köçkünlər məskunlaşıb. 2 nömrəli tədris korpusundakı yataqxanada isə məhdud sayda tələbə yerləşdirmək mümkündür. ADPU-da tələbələrin yataqxanada yerləşdirilməsi ilə bağlı müvafiq komissiya yaradılıb, meyarlar müəyyənləşdirilib və bu işə ədalətlə baxılır.

Rektor eyni zamanda yeni tədris ilində ADPU-ya tələbə qəbulunun nəticələri barədə məlumat verərək bildirib ki, ali təhsilin bakalavriat səviyyəsində ADPU-nun Azərbaycan bölməsinə 2090 nəfər, rus bölməsinə isə 230 nəfər olmaqla bütövlükdə 2320 nəfər tələbənin qəbul edilməsi nəzərdə tutulmuşdu. 1258 nəfər dövlət sifarişi əsasında, 896 nəfər isə ödənişli əsaslarla qəbul olunublar. ADPU-nun 5 filialına müxtəlif ixtisaslar üzrə ümumilikdə 675 nəfər tələbə qəbul olunub. Ali təhsilin magistratura səviyyəsində ADPU-ya 18



ixtisas və 19 ixtisaslaşma üzrə 403 nəfər qəbul olunub. Onlardan 164 nəfəri dövlət sifarişi əsasında, 239 nəfəri isə ödənişli əsaslarla qəbul olunublar. Builki tədris ilində yüksək bal toplayaraq ADPU-ya dövlət sifarişi əsasında qəbul olunmuş tələbələr ümumilikdə universitetə qəbul olunmuş tələbələrin təxminən 80%-ni təşkil edib. Azərbaycan Respublikasının Dövlət İmtahan Mərkəzinin verdiyi məlumata görə, yeni tədris ilində ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində qəbulolma faizi 97,18%-i təşkil edib. Cari tədris ilində ADPU-ya ali təhsilin magistratura səviyyəsində qəbulolma faizi 92,42%-i təşkil edib. Bu göstəriciyə görə ADPU universitetlər arasında III yeri tutub. Bütövlükdə isə bu il ali təhsilin həm bakalavriat səviyyəsində, həm də magistratura səviyyəsində göstəricilər əvvəlki illərlə müqayisədə xeyli yaxşıdır.

Rektor Cəfər Cəfərov iclasda həm də Təhsil Nazirliyində sentyabr ayının 2-də ali təhsil müəssisələrinin rəhbərlərinin iştirakı ilə keçirilən kollegiya iclası barədə məlumat verib. Qeyd edib ki, kollegiya iclasında ali təhsil müəssisələrinə tələbə qəbulunun nəticələrinin təhlili, təhsil haqlarının ödənilməsi, tələbə köçürmələri, Fransız-Azərbaycan Universiteti və ictimaiyyətlə əlaqələr məsələləri müzakirə edilib. Professor-müəllim heyətinin bilik və peşəkarlıq səviyyəsinin yüksəldilməsi, maddi-texniki bazanın təkmilləşdirilməsi, müasir əmək bazarının və işəgötürənlərin tələblərinə uyğun təhsil verilməsi, qabaqcıl beynəlxalq təcrübənin tətbiqi, təhsil haqlarının ödənilməsində çevikliyin təmin edilməsi üçün təhsil haqlarının elektron qaydada İnternet vasitəsilə ödənilməsi ilə bağlı səmərəli təkliflər irəli sürülüb. Artıq tələbə köçürmələri elektron qaydada transfer.edu.az saytı vasitəsilə həyata keçirilir. Hazırda ali təhsil müəssisələrinin ictimaiyyətlə əlaqələrinə xüsusi diqqət yetirilir.



Rektor vurğulayıb ki, bu gün dünyada ali təhsil müəssisələrinə tələbə cəlb edilməsi üçün mübarizə gedir və bu sahədə rəqabət var. Biz ADPU-nun maddi-texniki bazasını gücləndirməli, təhsilin keyfiyyətini yüksəltməliyik. Əmək intizamına ciddi əməl etməli, qəbul etdiyimiz qərarların icrasını təmin etməliyik. Tələbələrin arzu və istəklərini, tələblərini nəzərə almalı, universitetə daha çox tələbə cəlb edilməsi və onların arasından ən yaxşılarının seçilməsini diqqət mərkəzində saxlamalıyıq. ADPU-nun beynəlxalq qrant layihələrində iştirakı olduqca vacibdir. Eyni zamanda subordinasiya, etik davranış qaydaları gözlənilməlidir. Universitetdə əməkhaqqının artırılması da islahatların aparılması yolu ilə mümkündür. İstənilən təşkilat, o cümlədən ali təhsil müəssisəsi effektiv idarə olunmalıdır.

İclasda Tədris işləri üzrə prorektor, professor Malik Cəbrayılov, Elmi işləri üzrə prorektor, professor Asəf Zamanov, Tərbiyə işləri üzrə prorektor, professor Fikrət Rzayev, İnzibati-təsərrüfat işləri üzrə prorektor, dosent Səfər Hüseynov, ADPU-nun nəzdində fəaliyyət göstərən Azərbaycan Dövlət Pedaqoji Kollecinin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov çıxış edərək yay imtahan sessiyasının nəticələri, Sənəd Qəbulu Komissiyasının fəaliyyəti, idarəetmənin optimallaşdırılması, həyata keçirilən təmir-tikinti işləri və yeni tədris ilinə hazırlıqla bağlı görülən işlər barədə məlumat veriblər.

İclasın sonunda ADPU-nun rektoru, professor Cəfər Cəfərov prorektorlara, fakültə dekanlarına, kafedra müdirlərinə və struktur bölmələrin rəhbərlərinə Rektoryanı Şuranın iclasında qarşıya qoyulan vəzifələrin universitetin kollektivinə çatdırılmasını tapşırıb və bu istiqamətdə məqsədyönlü fəaliyyət göstərilməsini tövsiyə edib.

**Mənsur İBRAHİMLİ**

# ADPU-da I kurs tələbələri ilə tanışlıq görüşü keçirilib

Sentyabr ayının 14-də 2016-2017-ci tədris ilində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) bütün fakültələrində-Filologiya, Tarix və coğrafiya, Riyaziyyat və informatika, Kimya və biologiya, Fizika və texnologiya, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq və İbtidai təhsil fakültələrində I kursa qəbul olunmuş tələbələrlə tanışlıq görüşü keçirilib. Görüşün keçirilməsində məqsəd tələbə-gəncləri universitet, eləcə də təhsil alacaqları fakültə ilə tanış etmək, onları Boloniya prosesi, kredit sistemi, tədris və imtahan prosesi, dərsə davamiyyət və davranış qaydaları, ictimai-mədəni tədbirlərdə iştirak barədə məlumatlandırmaq olub.





ADPU-nun rektoru, professor Cəfər Cəfərov Filologiya fakültəsinin tələbələri ilə keçirilən görüşdə iştirak edərək onları bir daha universitetə qəbul olunmaları və yeni tədris ilinin başlanması münasibətilə təbrik edib, həyatda və təhsildə uğurlar arzulayıb. Rektor bildirib ki, ali təhsil müəssisələrində I kursa qəbul olunmuş tələbələrlə tanışlıq görüşünün keçirilməsi dünya təcrübəsində mövcuddur. Məqsəd tələbələrə istiqamət vermək, onlarda təhsil alacaqları universitet haqqında ilkin təsəvvürü formalaşdırmaqdır. Bu il ADPU-nun yaranmasının 95 ili tamam olur. ADPU Azərbaycanın ali təhsil sistemində xüsusi yerə və mövqeyə malikdir. ADPU tələbə heyətinin sayına və strukturuna görə ölkəmizin ən böyük universitetlərindən biridir. Hazırda ADPU-da təxminən 20 minədək tələbə təhsil alır. Universitetin Bakı şəhərində 4 tədris korpusu var. ADPU-nun 5 filialı-Ağcabədi, Şəki, Şamaxı, Quba və Cəlilabad filialları fəaliyyət göstərir. Eyni zamanda Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) də ADPU-nun nəzdində fəaliyyət göstərir. Bunlarla yanaşı, Təhsil naziri cənab Mikayıl Cabbarovun müvafiq əmri ilə Bakı şəhərindəki Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin yeni tədris ilindən ADPU-nun baza məktəbi hesab edilməsi müəyyən olunub. ADPU bizim ümumi evimizdir. Hamımız cəmiyyətdə müəllim adının, müəllim peşəsinin nüfuzunun yüksəldilməsi üçün əzmlə çalışmalıyıq. Biz sizə universitetdə keyfiyyətli təhsil almaq üçün məqsədyönlü fəaliyyət həyata keçiririk. Bu fəaliyyət isə qarşılıqlı olmalıdır. Biz birlikdə universitetdə şəffaf və obyektiv təhsil mühitinin yaradılmasına, təhsilin keyfiyyətinin yüksəldilməsinə, professor-müəllim heyətinin tədris-tədqiqat fəaliyyətinin genişdirilməsinə, əmək intizamının gücləndirilməsinə, bir sözlə, ADPU-nun dinamik inkişafına nail olmalıyıq.

Rektor Cəfər Cəfərov çıxışının sonunda tələbə-gənclərə yaxşı oxumağa, əsl vətəndaş və yüksək səviyyəli mütəxəssis kimi yetişməyi tövsiyə edib və onlara uğurlar arzulayıb.

Qeyd edək ki, digər fakültələrdə keçirilən tanışlıq görüşlərində ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev iştirak edib. Rəngarəng keçən həmin görüşlərdə də ADPU-nun tarixi, keçdiyi böyük inkişaf yolu, şöhrətli məzunları, ölkəmizin ali təhsil sistemindəki yeri və mövqeyi, tədris və imtahan prosesi, hazırda bu universitetdə həyata keçirilən islahatlar barədə tələbələrə ətraflı məlumat verilib. Vurğulanıb ki, müəllimlik müqəddəs və şərəfli peşədir. ADPU hazırda ölkəmizdə yüksəkixtisaslı pedaqoji və elmi-pedaqoji kadr hazırlığının baza məktəbi hesab edilir. ADPU ölkəmizdə elm və təhsilin inkişafına dəyərli töhfələr verib və hazırda bu istiqamətdə fəaliyyətini davam etdirir. ADPU-nun məzunları bu gün müxtəlif ali və orta ixtisas təhsili müəssisələrində, elmi-tədqiqat institutlarında, orta məktəblərdə, dövlət idarəçiliyinin müxtəlif sahələrində uğurla fəaliyyət göstərirlər.

Görüş zamanı universitetə yüksək balla daxil olan gənclərə tələbə biletləri təqdim edilib, dərs cədvəlləri paylanılıb, təhsil alacaqları fakültənin dekanlığı, kafedraları, tədris auditoriyaları və elmi-tədqiqat laboratoriyaları ilə tanış edilib.

**Gülnar SÜLEYMANOVA**

# Tələbə Gənclər Təşkilatının İdarə Heyətinin yeni tədris ilinin başlanmasına həsr edilmiş iclası keçirilib





Sentyabr ayının 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik akt zalında Tələbə Gənclər Təşkilatının (TGT) İdarə Heyətinin 2016-2017-ci tədris ilinin başlanmasına həsr edilmiş iclası keçirilib. Iclasda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev iştirak ediblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov iclasda çıxış edərək tələbələri yeni tədris ilinin başlaması münasibətilə təbrik edib, onlara həyatda və təhsildə uğurlar arzulayıb. Rektor qeyd edib ki, gənclik, xüsusən də, tələbəlik illəri insan həyatının ən gözəl, ən qiymətli dövrüdür. Gənclik enerjidir, inamdır, ümiddir, gələcəyə doğru atılan perspektivli addımların başlanğıcıdır. Məhz bu dövrdə insan öz bilik və bacarıqlarını formalaşdırır. Sonradan bu bilik və bacarıqlar zamanın tələblərinə uyğun olaraq yenilənir, təkmilləşir. Bu da təbiidir, çünki hər bir insan daim elmi potensialını artırmalı, genişləndirməlidir. Bu həm də insanın rəqabət və mübarizə mühitinə uyğunlaşmasında həlledici rol oynayır. Siz ali təhsil illərində həm yaxşı təhsil almalı, həm də ictimai təşkilatların işində fəal iştirak etməlisiniz. Eyni zamanda asudə vaxtınızın mənalı və səmərəli təşkilinə xüsusi diqqət yetirməlisiniz. İctimai təşkilatların işində fəal iştirak etməyiniz sizin idarəçilik qabiliyyətinizin formalaşmasına müsbət təsir göstərəcəkdir. Hazırda ADPU-da geniş islahatlar həyata keçirilir. Universitetdə təhsilin və tədrisin keyfiyyətinin yüksəldilməsi, sağlam təhsil mühitinin yaradılması, idarəetmənin optimallaşdırılması üçün məqsədyönlü fəaliyyət gerçəkləşdirilir. Xüsusi qeyd etmək istəyirəm ki, ADPU-nun yeni imicinin, işgüzar nüfuzunun formalaşdırılması bizim ən vacib vəzifələrimizdən biridir. Siz fəaliyyətinizi genişləndirməli, yenilikçi və geniş düşüncəli olmalı, mütərəqqi təşəbbüslərlə çıxış etməlisiniz. Siz eyni zamanda tədris və imtahan prosesinin səmərəli, şəffaf və obyektiv təşkil edilməsində universitet rəhbərliyinə kömək etməlisiniz. Hazırda ölkəmizdə müəllim hazırlığına xüsusi diqqət yetirilir. Müasir düşüncə baxımından təhsil də xidmət sahəsidir və bu sahənin optimallaşdırılması vacibdir. ADPU bizim ümumi evimizdir. Biz ADPU-nu müasir tələblərə cavab verən bir ali təhsil müəssisəsinə çevirməliyik. Onu da qeyd etmək istəyirəm ki, hərtərəfli bilik və bacarığa malik yüksəkixtisaslı pedaqoji kadrların hazırlanması həm də ölkəmizin milli təhlükəsizliyi üçün çox vacibdir.

ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev çıxış edərək bildirib ki, TGT universitetdə həyata keçirilən islahatların aparılmasına dəstək verməli, fəal və nizam-intizamlı olmalı, öz tərkibini genişləndirməli, universitetin əmlakının qorunmasında yaxından iştirak etməlidir. Prorektor Fikrət Rzayev eyni zamanda tələbələrə daha təşəbbüskar olmağı, universitetin və eləcə də ölkəmizin ictimai-mədəni həyatında fəal iştirak etməyi, cəmiyyətimizin inkişafına xidmət edən layihələri həyata keçirməyi tövsiyə edib.

TGT-nin sədri Cavid Hüseynov iclasda təşkilatın struktur dəyişiklikləri haqqında məlumat verib. İclasda TGT-nin İdarə Heyətinin yeni üzvləri seçilib, universitetə yeni qəbul olunmuş tələbələrlə işin aparılması və cari məsələlər müzakirə olunub, yeni tədris ili üçün fəaliyyət strategiyası müəyyən edilib.

Rektor Cəfər Cəfərov iclasda tələbə-gənclərin suallarını cavablandırıb.

# ADPU-da təkrar ali təhsil alanlarla görüş keçirilib

Sentyabr ayının 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2016-2017-ci tədris ilində universitetə qəbul olunmuş təkrar ali təhsil alanlarla görüş keçirilib. ADPU-nun rektoru, professor Cəfər Cəfərov görüşü açaraq təkrar ali təhsil alanları yeni tədris ilinin başlanması münasibətilə təbrik edib, onlara uğurlar arzulayıb. Rektor bildirib ki, cəmiyyətin inkişafının əsasında təhsil dayanır. İnkişaf etmiş ölkələrin təcrübəsi bunun bariz nümunəsidir. Bu gün ölkəmizdə müəllim peşəsinin nüfuzunun yüksəldilməsinə xüsusi diqqət yetirilir. Müəllim təlim-tərbiyə prosesində əsas fiqur, başlıca simadır. 3 ildir ki, Təhsil Nazirliyi tərəfindən "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Bu təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbələrə şamil olunur. Onlara əlavə 100 manat təqaüd verilir. Bununla yanaşı, orta məktəb müəllimlərinin bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi həyata keçirilib.





Rektor qeyd edib ki, ADPU ölkəmizdə ali pedaqoji təhsilin öncülü hesab edilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 26 noyabr 2015-ci il tarixli sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutunun (AMİ) ADPU-ya birləşməsi və onun filiallarının ADPU-nun strukturuna çevrilməsi nəticəsində ADPU ölkədə pedaqoji kadr hazırlığı ilə məşğul olan unikal ixtisaslaşmış ali təhsil müəssisəsinə çevrilmişdir. Bununla yanaşı, Nazirlər Kabinetinin 3 fevral 2016-cı il tarixli qərarı ilə Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə (ADPK) birləşdirilməklə ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci kimi fəaliyyət göstərməyə başlayıb. Hazırda ADPU-nun 5 filialı-Ağcabədi, Quba, Şəki, Şamaxı və Cəlilabad filialları fəaliyyət göstərir. ADPU-nun Bakı şəhərində 4 tədris korpusu var. Təhsil naziri cənab Mikayıl Cabbarovun müvafiq əmri ilə Bakı şəhərindəki Məmməd Rahim adına 7 nömrəli tam orta məktəb 2016-2017-ci tədris ilindən ADPU-nun baza məktəbi kimi müəyyənləşib. Geniş şəbəkəyə malik ali təhsil müəssisəsi olan ADPU-da hazırda 20 minədək tələbə təhsil alır.

Hazırda ADPU-da təhsilin keyfiyyətinin yüksəldilməsi, şəffaf və obyektiv tədris mühitinin yaradılması, eyni zamanda çevik, səmərəli və mütərəqqi idarəetmənin formalaşdırılması üçün islahatlar həyata keçirilir. Biz sizə keyfiyyətli təhsil xidməti göstərməyi özümüzün başlıca vəzifəmiz hesab edirik. Eyni zamanda ADPU-nun, bütövlükdə isə cəmiyyətin və məktəbin sizdən böyük gözləntiləri var. Siz bu gözləntiləri doğrultmalı, ölkəmiz üçün yüksək səviyyəli pedaqoji kadrlar kimi yetişməlisiniz.

ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Asəf Zamanov görüşdə çıxş edərək universitetdə tədrisin keyfiyyətinin yüksəldilməsi, professor-müəllim heyətinin bilik və peşəkarlıq səviyyəsinin artırılması, maddi-texniki bazanın gücləndirilməsi və idarəetmənin optimallaşdırılması üçün görülən işlərdən danışıb. Bildirib ki, bu il ADPU-ya müxtəlif ixtisaslar üzrə müvafiq fakültələrə 95 nəfər təkrar ali təhsilə qəbul olunub. Müqayisə üçün qeyd edək ki, 2014-2015-ci tədris ilində bu rəqəm 25, 2015-2016-cı tədris ilində isə 35 olub. Bu da təbii ki, müəllim peşəsinə olan marağın artmasının təzahürü kimi qiymətləndirilir.

Sonda təkrar ali təhsil alanların müxtəlif sualları cavablandırılıb.

**İctimaiyyətlə əlaqələr şöbəsi**

# ADPU-da 15 sentyabr - Bilik Gününə həsr edilmiş tədbir keçirilib

**Sentyabr ayının 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Bilik Gününə həsr edilmiş tədbir keçirilib. Tədbir iştirakçıları əvvəlcə ulu öndər Heydər Əliyevin ADPU-dakı abidəsi önünə gül dəstələri düzərək xatirəsinə ehtiramlarını ifadə ediblər, sonra tədbir universitetin həyətində davam edib. Tədbirdə ilk olaraq Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.**

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbirdə çıxış edərək universitetin professor-müəllim heyətini və tələbə kollektivini, xüsusilə də, bu il universitetə qəbul olmuş I kurs tələbələrini yeni-2016-2017-cı tədris ilinin başlanması münasibətilə təbrik edib, onlara cansağlığı və uğurlar arzulayıb. Rektor həmçinin yeni tədris ilində övladları ADPU-ya qəbul olmuş valideynləri də təbrik edərək onlara səmimi və xoş arzularını ifadə edib.



Rektor Cəfər Cəfərov çıxışında bildirib ki, xalqımızın böyük oğlu, müstəqil dövlətimizin memarı və qurucusu, ümummilli liderimiz Heydər Əliyev müəllim peşəsini çox yüksək qiymətləndirərək demişdir: "Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır. Bizim həyatımızda müəllimlik ən hörmətli peşədir. Müəllim cəmiyyətimizdə görkəmli yer tutur. Orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır. Azərbaycan ziyalıları arasında müəllimlər xüsusi yer tuturlar, hörmətə layiqdirlər, xüsusi qayğı və diqqətlə əhatə olunmalıdırlar. Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram".

Rektor çıxışı zamanı deyib ki, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev elm və təhsilə böyük qayğı və diqqət göstərir. Azərbaycanda təhsil sisteminin inkişafı dövlət siyasətinin əsasını təşkil edir və təhsilin inkişafı ölkəmizin ümumi inkişaf strategiyasının tərkib hissəsinə çevrilmişdir.

Eyni zamanda ölkəmizdə təhsil sahəsində bir çox layihələrin uğurla həyata keçirilməsində Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının (YAP) Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyeva böyük və əvəzsiz xidmətlər göstərir. Respublikamızda və eləcə də bir çox xarici ölkələrdə müxtəlif sosial-iqtisadi, humanitar layihələrin həyata keçirilməsinin birbaşa təşəbbüskarı və təşkilatçısı olan Mehriban xanım Əliyevanın fəaliyyətinin əsas istiqamətlərindən birini də məhz təhsilə qayğı və diqqət təşkil edir və onun bu sahədəki ardıcıl fəaliyyəti xalqımız tərəfindən yüksək qiymətləndirilir.

Azərbaycan yeniləşir, müasirləşir, onunla birgə ali təhsil sistemi də dəyişir. Bizim fəaliyyətimizdə əvvəlki illərdə olmayan dərəcədə təşəbbüskarlığa, novatorluğa ehtiyac var. Biliklər əsasında yaradılmış iqtisadiyyat qurmağa çalışırıq. Məhz buna görə təhsil ölkənin innovativ inkişafının əsasını təşkil etməlidir. Biz ölkənin gələcəyi ilə birbaşa bağlı olan bir prosesin tərkib hissəsiyik və bu prosesdə fəal iştirak etməliyik.

Sizin ali təhsil alacağınız ADPU 95 illik fəaliyyəti ərzində ölkəmizin ali təhsil müəssisələri sırasında xüsusi yer tutmuşdur. ADPU böyük inkişaf yolu keçərək ölkəmizdə təhsilin inkişafına mühüm töhfələr vermişdir. ADPU ölkəmizdə pedaqoji kadr hazırlığında baza ali məktəb hesab edilir.

Cəmiyyətin, ölkənin inkişafında müəllimin rolu əvəzsizdir. Müasir dövrümüzdə müəllimin rolu yalnız biliklərin ötürülməsi deyil, hər bir tələbəni, şagirdi oxumağı, öyrənməyi, öz bacarıqlarını maksimal şəkildə açmağı öyrətməkdir. Bunun üçün müəllimlər özləri bilikli, bacarıqlı olmalı, daim öz bilik və peşəkarlıq səviyyələrini artırmalıdırlar. Müəllimlərin ixtisasartırma və attestasiyasının yeni modelləri tətbiq olunmalıdır. Lider universitetlər bu yolu tutmalıdırlar. Onlar innovasiyalı təhsil infrastrukturunun yaradılması, yaxşı mütəxəssislərin cəlb olunması üçün çalışmalıdırlar.

Şagirdlərin düzgün peşə seçimi üçün məktəblər və universitetlər daha sıx əməkdaşlıq etməlidirlər. Təhsilin özü həyatın tələblərinə cavab verməli, təhsil standartları təkmilləşməlidir. Bu da universitet məzunlarının peşəkar karyera inkişafına kömək edəcəkdir.

Rektor çıxışında deyib ki, universitetdə təhsil almaq hər bir tələbənin həyatında yalnız həyatın maraqlı dövrü deyil, həm də onun peşəkar mütəxəssis kimi yetişməsində ən vacib bir mərhələdir. ADPU ailəsi olaraq bizim müqəddəs vəzifəmiz tələbələrə yüksək ali təhsil vermək, geniş dünyagörüşünə malik ixtisasli kadr hazırlığı prosesini həyata keçirməklə layiqli mütəxəssis yetişdirməkdir. ADPU-nun tələbəsi olaraq tədris proqramını mükəmməl mənimsəmək, bir neçə xarici dil öyrənmək, təhsil və təcrübənin üstünlüklərindən lazımınca faydalanmaq və universitetimizin şərəfini daim uca tutmaq sizlərin dərslərə müntəzəm hazırlığından birbaşa asılıdır.

Universitetdə sizə öz bilik və bacarıqlarınızı ortaya qoymaq üçün geniş şərait yaradılır. Bunun üçün də sizdən əsas tələbimiz dərslərinizdə məsuliyyətli olmaq, təklif olunan proqramlarda fəal iştirak etməyinizdir. Öz üzərinizdə nə qədər çox çalışsanız, bir o qədər də gələcəyin uğurlu mütəxəssisinə çevrilə bilərsiniz.

Sizlərdən tələbimiz budur: hər zaman öz üzərində çalışan, dərslərdə davamiyyətə əməl edən, ictimai-mədəni tədbirlərdə fəallıq göstərən və fərqlənən sevimli tələbələrimiz olun! Arzum budur ki, yaxşı təhsil alasınız, Azərbaycan, rus və ingilis dillərini mükəmməl öyrənəsiniz, Azərbaycan tarixini, mədəniyyətini, təbiətini dərindən biləsiniz. Həm də oxuya-oxuya təcrübə toplamağa çalışasınız. Bir sözlə, bu ali təhsil ocağında olan imkanlardan maksimum istifadə edib peşəkar kadr kimi yetişəsiniz.

Rektor Cəfər Cəfərov çıxışına davam edərək bildirib ki, yeni tədris ili ölkəmizin böyük və tanınmış ali təhsil müəssisələrindən biri olan ADPU üçün uğurlu göstəricilərlə başlayıb. Belə ki, builki tədris ilində ali təhsilin bakalavriat səviyyəsində ADPU-nun Azərbaycan bölməsinə 2090 nəfər, rus bölməsinə isə 230 nəfər olmaqla bütövlükdə 2320 nəfər tələbənin qəbul edilməsi nəzərdə tutulmuşdu. 1258 nəfər dövlət sifarişi əsasında, 896 nəfər isə ödənişli əsaslarla qəbul olunublar. ADPU-nun 5 filialına müxtəlif ixtisaslar üzrə ümumilikdə 675 nəfər tələbə qəbul olunub. Ali təhsilin magistratura səviyyəsində ADPU-ya 18 ixtisas və 19 ixtisaslaşma üzrə 403 nəfər qəbul olunub. Onlardan 164 nəfəri dövlət sifarişi əsasında, 239 nəfəri isə ödənişli əsaslarla qəbul olunublar.

Qeyd etməyə dəyər ki, builki tədris ilində yüksək bal toplayaraq ADPU-ya dövlət sifarişi əsasında qəbul olunmuş tələbələr ümumilikdə universitetə qəbul olunmuş tələbələrin təxminən 80%-ni təşkil edib. Azərbaycan Respublikasının Dövlət İmtahan Mərkəzinin verdiyi məlumata görə, yeni tədris ilində ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində qəbulolma faizi 97,18%-i təşkil edib. Cari tədris ilində ADPU-ya ali təhsilin magistratura səviyyəsində qəbulolma faizi 92,42%-i təşkil edib. Bu göstəriciyə görə ADPU universitetlər arasında III yeri tutub. Bütövlükdə isə bu il ali təhsilin həm bakalavriat səviyyəsində, həm də magistratura səviyyəsində göstəricilər əvvəlki illərlə müqayisədə xeyli uğurludur. Digər ali təhsil müəssisələri ilə müqayisədə ADPU-da dövlət sifarişi əsasında yerlərin çoxluğu dövlət tərəfindən müəllim peşəsinə qəbul olunanlara rəğbətləndirmənin tətbiqinin nəticəsidir.



Bu il ADPU-ya "Fizika müəllimliyi", "İnformatika müəllimliyi", "Coğrafiya müəllimliyi", "Korreksiyaedici təlim", "Məktəbəqədər təlim və tərbiyə", "Təhsildə sosial-psixoloji xidmət", "Kimya və Biologiya müəllimliyi", "Təsviri incəsənət müəllimliyi", "Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi" (qızlar üçün fiziki tərbiyə) ixtisasları üzrə ilk dəfə rus bölməsinə tələbə qəbulu aparılmışdır. Əvvəlki illərdə rus bölməsinə yalnız "Tarix müəllimliyi", "Riyaziyyat müəllimliyi", "İbtidai sinif müəllimliyi" və "Biologiya müəllimliyi" ixtisasları üzrə tələbə qəbulu aparılırdı. Bu il isə rus bölməsinə 13 ixtisas üzrə tələbə qəbulu aparılıb və 140 nəfər tələbə daxil olub. Bu da əvvəlki illərlə müqayisədə faiz göstəricisinə görə müsbət göstəricidir. Cari ildə 500 və 500-dən yuxarı bal toplayıb müəllimlik ixtisasını seçənlərin sayı 117 nəfərdir.

Eyni zamanda universitetə yeni tədris ilində qəbul olunmuş və qeydiyyatdan keçmiş tələbə-gənclərlə aparılan sosioloji sorğunun nəticələri göstərir ki, bu gənclər düşünülmüş şəkildə, ürəklərinin hökmü ilə və böyük həvəslə müqəddəs, şərəfli, eyni zamanda məsuliyyətli peşə olan müəllim peşəsini seçiblər. Belə ki, sorğuda iştirak edən tələbələrin 70-80%-i müəllim peşəsini sevdiklərini bildirir və ADPU-da keyfiyyətli ali təhsil alacaqlarını düşünürlər. Sorğuda iştirak edən həmin tələbələrin fikirlərinə görə, strateji sahə olan pedaqoji sahədə fəaliyyət göstərmənin təməli onların mükəmməl təhsil alacaqları ali təhsil müəssisəsi ilə daha çox bağlıdır. Bu ali təhsil müəssisəsi isə ADPU-dur.

Bundan başqa, bu il ayrı-ayrı ixtisaslara tələbə qəbulunun nəticələrini 2015-2016-cı tədris ilinin qəbulunun nəticələri ilə müqayisə edərkən maraqdoğuran məqamlarla qarşılaşırıq. Məsələn, ötən tədris ilində "Fizika müəllimliyi" ixtisasına maksimum qəbul balı 372 bal, bu il isə 509 bal olmuşdur. Ötən tədris ili ilə müqayisədə bu il həm də "Tarix və coğrafiya müəllimliyi" ixtisasına yüksək balla daxil olanların sayı xeyli artmış, maksimum bal həddi 504 baldan 603 bala yüksəlmişdir. Bu ixtisas üzrə keçən il cəmi 3 nəfər 500 bal topladığı halda, bu il onların sayı 13 nəfər olmuşdur. "Korreksiyaedici təlim" ixtisasına ötən il maksimum keçid balı 499 bal olduğu halda, cari ildə bu rəqəm 558 bala yüksəlmişdir.

ADPU-da həyata keçirilən əsaslı və cari təmir işləri başa çatıb. Bu da öz növbəsində təhsil-tədris və əmək şəraitinin yaxşılaşmasına, həmçinin universitetin yeni imicinin formalaşmasına müsbət təsir edəcəkdir. Sentyabr ayının 14-də ADPU-nun bütün fakültələrində I kursa qəbul olunmuş tələbələrlə görüş keçirilib. Görüşün keçirilməsində məqsəd tələbə-gəncləri universitet, eləcə də təhsil alacaqları fakültə ilə tanış etmək, onları Boloniya prosesi, kredit sistemi, tədris və imtahan prosesi, dərsə davamiyyət və davranış qaydaları, ictimai-mədəni tədbirlərdə iştirak barədə məlumatlandırmaq olub.

Xüsusi qeyd etmək istəyirik ki, bu il ADPU-ya qəbul olmuş I kurs tələbələrinin kollokvium və semestr imtahanları yazılı qaydada aparılacaqdır. Kollokvium və imtahanların yazılı formada keçirilməsində məqsəd tədrisin keyfiyyətini yaxşılaşdırmaq, şəffaflığı və obyektivliyi təmin etməkdir.

Tədbirdə çıxış edən Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov universitetə qəbul olmuş tələbə-gəncləri təbrik edərək onlara uğurlar arzulayıb, müqəddəs və şərəfli müəllim adını doğrultmağı tövsiyə edib.

Tədbirdə universitetə yüksək balla qəbul olan gənclərə tələbə biletləri təqdim edilib. Məlumat üçün onu da bildirək ki, rektor Cəfər Cəfərov sentyabrın 15-də həm də ADPU-nun 2,3,4 nömrəli tədris korpuslarında Bilik Günü münasibətilə keçirilən tədbirlərdə iştirak edərək tələbələri təbrik edib, onlara uğurlar arzulayıb.

Qeyd edək ki, sentyabrın 15-də ADPU-nun 5 filialında - Ağcabədi, Şəki, Şamaxı, Quba və Cəlilabad filiallarında və ADPU-nun baza məktəbi olan Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbdə Bilik Gününə həsr edilmiş tədbirlər keçirilib.

**Könül NƏZƏROVA**

# ADPU-nun rektoru, professor Cəfər Cəfərov Milli Məclisin Gənclər və idman komitəsinin sədri Fuad Muradovla görüşüb

Sentyabr ayının 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetin(ADPU) rektoru, professor Cəfər Cəfərov Milli Məclisin Gənclər və idman komitəsinin sədri Fuad Muradovla görüşüb. Rektor qonağı salamlayaraq bu görüşün keçirilməsindən məmnunluq duyduğunu bildirib. Qeyd edib ki, əsası ümummilli liderimiz Heydər Əliyev tərəfindən qoyulmuş təhsil islahatları Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin xüsusi qayğı və diqqəti sayəsində genişlənərək məzmun və keyfiyyət baxımından yeni inkişaf mərhələsinə daxil olub. Azərbaycanda təhsil siyasəti dövlət siyasətinin proritet istiqamətlərindən biridir və ölkəmizin davamlı inkişaf strategiyasının əsasında dayanır.

Rektor Cəfər Cəfərov həmçinin millət vəkili Fuad Muradova rəhbərlik etdiyi ali təhsil müəssisəsinin fəaliyyət istiqamətləri və strateji hədəfləri barədə məlumat verərək bildirib ki, ADPU ölkəmizin ali təhsil sistemində xüsusi yer tutur. Tələbə heyətinin sayına və strukturuna görə ADPU ölkəmizin ən böyük universitetlərdən biridir. Bu gün ADPU-da 20 minədək tələbə təhsil alır. Ölkə rəhbərliyi yüksəkixtisaslı pedaqoji kadrların hazırlanmasına xüsusi diqqət yetirir və bu istiqamətdə ciddi addımlar atılır. Hazırda ADPU-da təhsilin keyfiyyətinin yüksəldilməsi, şəffaf, obyektiv tədris və imtahan mühitinin yaradılması, professor-müəllim heyətinin bilik və peşəkarlıq səviyyəsinin artırılması, maddi-texniki bazanın gücləndirilməsi, beynəlxalq əlaqələrinin genişlənməsi, idarəetmənin optimallaşdırılması, diferensial əməkhaqqının tətbiq edilməsi, bir sözlə, universitetin yeni və müasir imicinin formalaşması üçün ciddi islahatlar həyata keçirilir.

Milli Məclisin Gənclər və idman komitəsinin sədri Fuad Muradov da öz növbəsində ADPU-da keçirilən bu görüşdən məmnunluq duyduğunu bildirərək ölkəmizdə uğurla həyata keçirilən gənclər siyasətindən danışıb və bu sahədə görülən işlər barədə məlumat verib. Bildirib ki, gənclər cəmiyyətin fəal və aparıcı qüvvəsidir. Azərbaycan dövləti gənclərin yüksək səviyyədə təhsil almalarına, ölkəmizin ictimai-siyasi həyatında fəal iştirak etmələrinə, onların dövlət idarəçiliyinə cəlb edilmələrinə və əsl vətəndaş kimi formalaşmalarına xüsusi diqqət yetirir.

**İctimaiyyətlə əlaqələr şöbəsi**

# ADPU-da daxili qiymətləndirmə sənədinin hazırlanması üçün yaradılan işçi qrupun ilk təlimi keçirilmişdir

Əvvəlcə onu qeyd edək ki, Azərbaycan Respublikası Təhsil Nazirliyinin "Twinninq" layihəsi çərçivəsində hazırlanan yeni akkreditasiya qaydalarının pilot qiymətləndirilməsinin həyata keçirilməsi üçün seçilən 3 ali təhsil müəssisəsindən biri Azərbaycan Dövlət Pedaqoji Universitetidir (ADPU). Bu məqsədlə də sentyabr ayının 29-da finlandiyalı ekspertlərin iştirakı ilə daxili qiymətləndirmə sənədinin hazırlanması üçün ADPU-da yaradılan işçi qrupun ilk təlimi keçirilmişdir. Təlimdə ADPU-nun prorektorları, fakültə dekanları, aparıcı kafedraların müdirləri, Təhsilin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin əməkdaşları, mütəxəssislər iştirak etmişlər. Məlumat üçün onu da qeyd edək ki, oktyabr və noyabr aylarında təlimin ikinci və üçüncü mərhələləri də keçiriləcəkdir. Təlimlərin sonunda işçi qrupun ADPU-nun özünüqiymətləndirmə sənədini hazırlaması nəzərdə tutulur. Özünüqiymətləndirmə sənədi xarici ekspertlərin də cəlb olunacağı qrup tərəfindən dəyərləndiriləcək.



Təlimdə çıxışlar edilmiş, suallar cavablandırılmış, iştirakçılara sertifikatlar təqdim edilmişdir.

Sonda Finlandiyanın təhsil sistemi haqqında məlumat verilmişdir.

**İctimaiyyətlə əlaqələr şöbəsi**

# İbtidai təhsil fakültəsində geniş istehsalat müşavirəsi keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsində professor-müəllim heyətinin və əməkdaşların iştirakı ilə geniş istehsalat müşavirəsi keçirilib. İstehsalat müşavirəsində ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov iştirak edib. Müşavirədə İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov çıxış edərək 2015-2016-cı tədris ilində fakültənin tədris və elmi fəaliyyətini təhlil edib, təlimin keyfiyyətinin yüksəldilməsi və qarşıda duran vəzifələrdən danışıb.





Tədris işləri üzrə prorektor, professor Malik Cəbrayılov 2016-2017-ci tədris ilində universitetin inkişaf perspektivləri haqqında geniş məlumat verib, əməkdaşların çoxsaylı suallarını cavablandırıb.

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində yuxarı tədris ili tələbələri ilə görüş keçirilmişdir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil , psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində yuxarı tədris ili tələbələri ilə görüş keçirilmişdir. Məktəbəqədər təhsil , psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, dosent Şəhla Əliyeva görüşdə çıxış edərək tələbələrin tədris, elmi və ictimai fəaliyyətlərindən, təlimin keyfiyyətinin yüksəldilməsi ilə bağlı qarşıda duran vəzifələrdən danışmışdır. Qeyd edək ki, görüşdə ADPU-nun Təhsilin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktor müavini, dosent Ənvər İmanov iştirak etmişdir. Dosent Ə.İmanov ölkəmizdəki sabitlikdən, milli təhlükəsizliyin yüksək səviyyədə təmin olunmasından, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin təhsilə və təhsil işçilərinə göstərdiyi yüksək diqqət və qayğıdan danışmışdır. O, həmçinin ADPU-nun rektoru, professor Cəfər Cəfərovun rəhbərliyi ilə universitetdə aparılan islahatlardan, bu islahatların təhsilin səmərə və keyfiyyətinin yüksəlməsinə müsbət təsir edəcəyindən, ali təhsilli pedaqoji kadr hazırlığının müasir səviyyəyə qalxmasına kömək edəcəyindən danışmış, tələbələrə bir sıra dəyərli məsləhətlər vermiş, eyni zamanda tələbə-gənclərin tədris, imtahan prosesi və ümumilikdə universitetlə bağlı suallarını müfəssəl və ətraflı cavablandırmışdır. Görüşdə iştirak edən professor-müəllim heyəti də tədrislə bağlı maraqlandıqları məsələlərdən danışmışlar. Görüş maraqlı və sağlam diskussiya şəraitində davam etmişdir. İnanırıq ki, tələbələrimiz belə görüşlərdən çox faydalanırlar.



